**NAMİQ ABBASOV**

# *BARBAREA BRACHYCARPA* BOISS. – XIRDAMEYVƏ VƏZƏRƏK (*BRASSICACEA*) AZƏRBAYCAN RESPUBLİKASI FLORASI ÜÇÜN YENİ NÖVDÜR

*Məqalədə Naxçıvan Muxtar Respublikası Ordubad rayonu, Nəsirvaz kəndi ətrafında Qaranquş yaylağı – Gəmiqaya ərazisində aparılan tədqiqatlar zamanı müəyyən edilmiş, Muxtar respublika üçün yeni növ hesab edilən Barbarea brachycarpa Boiss. – Xırdameyvə vəzərək növünün bioekoloji, fitosenoloji xüsusiyyətləri haqqında danışılır. Qaranquş yaylağı Naxçıvan Muxtar Respublikasının Ordubad rayonu ərazisindəki Parağaçay qəsəbəsindən və Tivi kəndindən şimal-şərqdə, Nəsirvaz kəndindən şərqdə, Kiçik Qafqaz dağ sisteminin ən hündür silsiləsi sayılan Zəngəzur sıra dağlarının mərkəz hissəsində yerləşir. Silsilənin mərkəz hissəsinin mütləq hündürlükləri 3500 metri keçən Qazangöldağ (3815.5 m), Dəvəboynu (3650.5 m), Qapıcıq (3906 m) və digər zirvələrdən ibarətdir. Bu növün nadir statuslu olduğunu nəzərə alaraq, onun Azərbaycan və Naxçıvan respublikasının "Qırmızı Kitab"ının gələcəkdəki yeni nəşrinə daxil edilməsi vacibdir.*

**Açar sözlər:** *flora, Gəmiqaya, vəzərək, endemik, alp qurşaq, qaya-töküntü, "Qırmızı Kitab".*

**Giriş.** Naxçıvan Muxtar Respublikası füsunkar təbiətə, zəngin flora və bitki örtüyünə malik olan tipik dağlıq ölkədir. Özünəməxsus torpaq-iqlim xüsusiyyətləri, aydın seçilən şaquli zonallığı respublikanın digər bölgələrində və bütövlükdə, Cənubi Qafqazda fərqlənir. Son floristik və taksonomik araşdırmalardan məlum oldu ki, Muxtar respublikanın florası 160 fəsilə və 910 cinsdə cəmlənmiş 3021 ali sporlu, çılpaqtoxumlu və örtülütoxumlu bitki növləri ilə təmsil olunur [2, s. 245]. Ordubad rayonu muxtar respublikanın zəngin flora biomüxtəlifliyinə malik, bir ərazisidir. Bu regionun az tədqiq olunmuş yüksək dağ zonalarından biri də Gəmiqaya-Qaranquş yaylağıdır. Qaranquş yaylağı Naxçıvan Muxtar Respublikasının Ordubad rayonu ərazisindəki Parağaçay qəsəbəsi və Tivi kəndindən şimal-şərqdə, Nəsirvaz kəndindən şərqdə, Kiçik Qafqaz dağ sisteminin ən hündür silsiləsi sayılan Zəngəzur sıra dağlarının mərkəz hissəsində yerləşir. Silsilənin mərkəz hissəsi mütləq hündürlükləri 3500 metri keçən Qazangöldağ (3815.5 m), Dəvəboynu (3650.5 m), Qapıcıq (3906 m) və digər zirvələrdən ibarətdir. Nəsirvazçay və Parağaçay kimi sulu dağ çayları öz mənbələrini Qapıcıq zirvəsinin ətəklərinə axan onlarca zümrüd gözlü bulaqlardan götürür [1]. Tədqiqat obyekti burada rast gəlinən *Brassicacea* Burnett. fəsiləsinə aid yeni bir tapıntıdır. Bu fəsilə Naxçıvan MR florasında ən çox növ tərkibinə – 66 cins, 165 növə malik olmaqla, bir çox təbii landşaftlarda inkişaf edirlər ki, bu da biogeosenozların formalaşmasında mühüm əhəmiyyətə malikdir [2, s. 147-157]. Bu baxımdan bu fəsilə bitkilərinin, xüsusilə də yuxarı dağ qurşaqlarında yayılmış növlərin tədqiq olunması aktual məsələlərdən biridir.

**Material və metodika.** Tədqiqatlar 2020-ci ildə Naxçıvan MR Ordubad rayonu ərazisində aparılmışdır. Tədqiqat işləri Ordubad rayonu Nəsirvaz kəndətrafı, Qapıcıq dağının ətəyində, subalp qurşaqda yerləşən Gəmiqaya (N 39°09'29.75'' E 45°58'23.49'') d.s.h. 2826 m ərazisində aparılmışdır. Əsas xarakterik material olaraq çöl tədqiqatlarında tərəfimizdən toplanılmış herbari materialları, floristik, fitosenoloji məlumatlar, herbari fondunda saxlanılan tədqiqat materialı, eləcə də ədəbiyyat mənbələri hesab olunur. Çöl tədqiqatları ümumi qəbul edilmiş floristik və geobotaniki metodlarla aparılmışdır [3, s. 85-90; 6, s. 130-150; 8, s. 253; 10, s. 15-35].

**Alınmış nəticələrin müzakirəsi.** *Brassicacea* Burnett. fəsiləsinin Yer kürəsində 357

cinsi və 4000 artıq növü məlumdur [12]. Bu fəsiləyə daxil olan *Barbarea* R.Br. cinsinin yer kürəsində 32 növü məlumudur. Qafqazda 7 növ, Azərbaycanda 4, Naxçıvanda 4 növü yayılmışdır. Türkiyədə *Barbarea* cinsi son zamanlarda aparılan tədqiqatlara görə, 13 növ, 3 yarımnöv və 6 variasiya ilə təmsil olunur. Bu taksonlardan 9-u endemikdir [4, s. 10-11; 13, 14].

2020-ci ildə Naxçıvan Muxtar Respublikası ərazisində floranı öyrənmək məqsədilə aparılan tədqiqatlar zamanı müəllif tərəfindən Ordubad rayonu Nəsirvaz kəndi ətrafında Gəmiqaya adlanan ərazidə *Brassicaceae* fəsiləsinə aid yeni növ – *Barbarea brachycarpa* Boiss. – Xırdameyvə vəzərək növü müəyyən edilmişdir (şəkil). Aşkar edilən bu növ adları çəkilən heç bir ədəbiyyat mənbələrində muxtar respublika ərazisi üçün göstərilməmişdir [2, s. 147-157; 3; 4, s. 1-45; 5, s. 434-435; 7, s. 240, 8, s. 251-252; 11, s. 433-438]. Azərbaycanda ilk dəfə olaraq Naxçıvan MR florasında yeni yayılma arealı müəyyən edilmişdir.

Aşağıda *Barbarea brachycarpa* Boiss növünün adlandırılması son müasir beynəlxalq təsnifat sistemlərinə [12, 13, 14] görə verilmişdir:

**Regnum –** *Plantae*
**Divisio –** *Tracheophyta*
**Classis –** *Magnoliopsida*
**Ordo** – Brassicales
**Familia –** Brassic*aceae*
**Genus –** *Barbarea*
**Species –** *Brachycarpa*
**Qəbul edilmiş beynəlxalq adı:** *Barbarea brachycarpa* Boiss.
Sinonimləri:
*Barbarea brachycarpa* subsp. *Anfractuosa* (Hartvig&Strid) Parolly & Eren
*Barbarea brachycarpa* subsp. *Robusta* (Coode & Cullen) Parolly & Eren

Aşağıda bu növün qısa olaraq bioekologiyası və fitosenologiyası haqqında məlumat verilmişdir. Ləçəklər sarı və ya narıncı rəngdə olub dırnaqcıqlıdır. Yumurtalıq oturaq, qısa sütüncüqludur və ikiqanadlı ağızcığa malikdir. Qını taylı silindrik-dördtillidir, aydın görünən qalın orta və yan damarlıdır. Toxumları bir cərgəlidir, ellipsvarı, şişkin və ya azacıq yastılaşmışdır. İkiillik və çoxillik bitkilərdir, adətən liraşəkilli-lələkvarı yarpaqları vardır. İyun-iyul aylarında çiçək açır avqust-sentyabrda meyvə verir. Bu növ qəbul edilir və onun vətəni Türkiyə-Şimal-qərb bölgəsi və İrandır [3, s. 454-456].



**Şəkil.** *Barbarea brachycarpa* Boiss. – Xırdameyvə vəzərək.

**Naxçıvan MR florasında yayılması.** Yuxarı dağ qurşağında, alp-subalp zonasında,

quru, çınqıllı-daşlı yamaclarda, qaya-töküntülərdə, su kənarında rast gəlinir. Azərbaycanda tərəfimizdən ilk dəfə olaraq Ordubad rayonun Nəsirvaz kəndi ətrafında, Gəmiqaya ərazisində qaya-töküntülərdən axan kiçik "Bacaçay" qolunda yeni yayılma arealı müəyyən edilmişdir. İyun-iyul aylarında çiçək açır, avqust-sentyabr aylarında isə meyvə verir.

**Yeni növün tapıldığı ərazi:** Ordubad rayonun Nəsirvaz kəndətrafı Qaranquş yaylağı, subalp zona, daşlı-çınqıllı yamaclar. Yeni tapıntı "Bacaçay" adlanan kiçik çayın sol qolunda aşkar edilmişdir. GPS koordinatı: N 39°09'29.75'' E 45°58'23.49'', d.s.h. 2826 m.

Yeni tapılmış növün dijital səkilləri çəkilmiş və plantarium.ru onlayn təyinat saytına yüklənmişdir.

Bu növ müəyyən olunduğu ərazidə aşağıda adları göstərilən dağ-kserofit bitkilərlə qruplaşmalar əmələ gətirir: *Allium schoenoparsum* L., *Aster alpinus* L., *Arenaria rotundifolia* M.Bieb., *Blitum vurgatum* L., *Campanula tridentata* Schreb., *Papaver fugax* Poir., *Papaver orientale* L., *Vicia alpestris* L., *Scutellaria orientalis* L., *Marrubium plumosum* L., *Hypercium scabrum* L., *Rumex alpinus* L., *Lamium album* L., *Campanula zangezura* (Lipsky) Kolak. & Serdyuk., *Rumex alpinus* L., *Nepeta grandiflora* M.Bieb., *Hesperis hirsutissima* (N.Busch.) Tzvelev, *Stachys balansae* Boiss. & Kotsghy., *Thymus praecox subsp. grosshemii* (Ronniger) Jalas, *Lallemantia canescens* (L.) Fisch., *Doronicum macrophyllum* Fisch. ex Hornem., *Cirsium kosmelii* (Adams) Fisch. ex Hohen. və s.

**Nəticə.** Tədqiqat zamanı müəyyən edilmiş *Barbarea brachycarpa* Boiss. – Xırdameyvə vəzərək növü Azərbaycan florası üçün yeni növdür. Bu növ ilk dəfə olaraq Türkiyədən (Anadolu) təsvir edilmişdir. Türkiyədə aparılan son tədqiqatlara və genetik təhlillərə əsasən bu növün gen mərkəzinin Anadolu olduğu müəyyən edilmişdir [4, s. 3].

Məhdud areal və ya sahələrdə yayılmış, mənfi təsirlərə məruz olan həssas növ kimi gələcəkdə nəşr olunacaq Azərbaycanın, eləcə də Naxçıvan Muxtar Respublikasının "Qırmızı kitabı"nın yeni nəşrinə daxil edilməsi məsləhət görülür. Yeni tapılan növün herbari nümunələri AMEA Naxçıvan Bölməsi Bioresurslar İnstitutunun Herbari Fondunda saxlanılır.

## ƏDƏBİYYAT

1. Akademik Həsən Əliyev adına Zəngəzur Milli Parkı. Naxçıvan: Əcəmi, 2019, 286 s.
2. Talıbov T.H., Ibrahimov Ə.Ş. Naxçıvan Muxtar Respublikası florasının taksonomik spektri (*Ali sporlu, çılpaqtoxumlu və örülütoxumlu bitkilər*). İkinci nəşr, Bakı: Şirvannəşr, 2021, 426 s.
3. Güner A. Türkiye Bitkileri Listesi (Damarlı Bitkiler). Kasım: ANG Vakfı, Nezahat Gökyiğit Botanik Bahçesi, 2012, 1290 s.
4. Orhan G. Türkiye'deki Barbarea R.Br. (*Brassicaceae*) cinsi taksonlari arasindaki genetik akrabalik ilişkilerinin issr yöntemi ile incelenmesi. Selçuk Üniversitesi Fen Bilimleri Enstitüsü Biyoloji anabilim dali, 2016, 56 s.
5. Конспект флоры Кавказа: В 3-х тт. Т. III, часть 2, СПб., 2006, 467 с.
6. Серебряков И.Г. Жизненные формы высших растений и их изучение / Полевая геоботаника. Т. III, Москва-Ленинград, 1964, 530 с.
7. Флора Азербайджана / Под. ред. И.И.Карягина. Т. IV, Баку: Изд. АН Аз ССР, 1953, 402 с.
8. Черепанов С.К. Сосудистые растения России и сопредельных государств. СПб., 1995, с. 991.
9. Шенников А.П. Экология растений. Москва: Сов. Наука, 1951, 375 с.

10. Ярошенко П.Д. Геоботаника (основные понятия, направления и методы). Ленинград: Изд-во АН СССР, 1969, 200 с.
11. Davis P. Flora of Turkey and the east Aegean islands. V. I, Edinburgh: Edinburgh University Press, 1965-1997, 437 p.
12. http://www.catalogue of life
13. http: // www.the plant list.org
14. https://www.bizimbitkiler.org.tr

***AMEA Naxçıvan Bölməsi***
***E-mail: namiq-araz@mail.ru***

**Namig Abbasov**

**_BARBAREA BRACHYCARPA_ BOISS. – A NEW SPECIES FOR THE FLORA OF THE REPUBLIC OF AZERBAIJAN**

The paper deals with the bioecological and phytocoenological features of *Barbarea brachycarpa* Boiss. (*Brassicacea* Burneth.) species, identified in the course of the research conducted on Mount Gemigaya near the village of Nasirvaz, Ordubad region, Nakhchivan Autonomous Republic. The Garangush Plateau is located northeast of the village of Paragachay and the village of Tivi in the Ordubad district of Nakhchivan, east of the village of Nasirvaz, in the central part of the Zangezur Range. The central part of the ridge is made up of the peaks of Gazangeldag (3815.5 m), Davaboina (3650.5 m), Gapujig (3906 m), and other peaks with an absolute height of 3500 meters. Given that this species is rare, it is recommended in the future to include it in the new edition of the "Red Book" of Azerbaijan and the Nakhchivan Autonomous Republic.

**Keywords*:*** *flora, Gemigaya, endemic, alpine belt, rock-scree, Red Data Book.*

**Намиг Аббасов**

**_BARBAREA BRACHYCARPA_ BOISS. (СУРЕПКА КОРОТКОПЛОДНАЯ) – НОВЫЙ ВИД ДЛЯ ФЛОРЫ АЗЕРБАЙДЖАНСКОЙ РЕСПУБЛИКИ**

В статье рассматриваются биоэкологические и фитоценологические особенности вида *Barbarea brachycarpa* Boiss. (*Brassicacea* Burneth.), выявленного в ходе исследований, проведенных на территории горы Гемигая в окрестностях села Насирваз Ордубадского района Нахчыванской Автономной Республики. Плато Гарангуш расположено к северо-востоку от поселка Парагачай и села Тиви в Ордубадском районе Нахчыванской, к востоку от села Насирваз, в центральной части Зангезурского хребта. Центральную часть хребта составляют вершины Газангелдаг (3815,5 м), Давабойну (3650,5 м), Гапуджиг (3906 м) и другие вершины с абсолютной высотой 3500 метров. Учитывая, что этот вид является редким, рекомендуется в будущем для включения его в новое издание "Красной книги" Азербайджана и Нахчыванской Автономной республики.

**Ключевые слова**: *флора, Гемигая, эндемик, альпийский пояс, скально-осыпная, "Красная книга".*

*(Akademik Tariyel Talıbov tərəfindən təqdim edilmişdir)*

**Daxilolma tarixi: İlkin variant 06.04.2022**
**Son variant 10.05.2022**

**UOT 632.9.63:502.17**